**Əlilliyi olan şəxslərin hüquqları haqqında**

AZƏRBAYCAN RESPUBLİKASININ QANUNU

Bu Qanun Azərbaycan Respublikası Konstitusiyasının 94-cü maddəsinin I hissəsinin 1-ci bəndinə uyğun olaraq əlilliyi olan şəxslər barəsində dövlət siyasətinin əsaslarını və onların hüquqlarının müdafiəsi sahəsində dövlətin vəzifələrini müəyyən edir, əlilliyə səbəb olan risklərin, əlillik əlamətinə görə ayrı-seçkiliyin bütün formalarının aradan qaldırılmasını, əlilliyi olan şəxslərin reabilitasiyasını, cəmiyyətin həyatında tam həcmdə iştirakını və sosial inteqrasiyasına şərait yaradılmasını, onlara aid olan strategiya və proqramlara dair qərarların qəbulu prosesinə fəal cəlb olunmasını, əlilliyi olan şəxslərin hüquq və azadlıqlarının tam və bərabər səviyyədə həyata keçirilməsini, onların şərəf və ləyaqətinin müdafiəsi sahəsində yaranan münasibətləri tənzimləyir.

## 1-ci fəsil
## ÜMUMİ MÜDDƏALAR

### Maddə 1. Əsas anlayışlar

1.0. Bu Qanunda istifadə olunan anlayışlar aşağıdakı mənaları ifadə edir:

1.0.1. əlillik - müxtəlif maneələrlə qarşılaşdığı zaman şəxsin digər şəxslərlə bərabər səviyyədə cəmiyyət həyatında tam və səmərəli iştirakına mane olan sabit fiziki, psixi, əqli və ya hissiyyat pozuntularının olması;

1.0.2. əlilliyi olan şəxs - müxtəlif maneələrlə qarşılaşdığı zaman digər şəxslərlə bərabər səviyyədə cəmiyyət həyatında tam və səmərəli iştirakına mane olan sabit fiziki, psixi, əqli və ya hissiyyat pozuntuları olan şəxs~~, o cümlədən sağlamlıq imkanları məhdud 18 yaşınadək uşaq~~;[1]

1.0.3. əlilliyə görə ayrı-seçkilik - əlilliklə bağlı istənilən fərqqoyma, istisna və məhdudiyyət tətbiqetmə, o cümlədən bu Qanuna uyğun olaraq~~, müyəssərliyə nail olmaq üçün~~ ağlabatan uyğunlaşmadan imtina; [2]

1.0.4. ağlabatan uyğunlaşma - əlilliyi olan şəxslər tərəfindən əsas insan hüquqlarının və azadlıqlarının digərləri ilə bərabər səviyyədə həyata keçirilməsinin təmin olunması məqsədi ilə *hər bir konkret halda* zəruri və mümkün uyğunlaşma və düzəlişlər edilməsi; [3]

1.0.5. əlilliyin qarşısının alınması - əlilliyin erkən diaqnostikası, həmçinin sağlamlığın qorunması tədbirləri, ətraf mühitin ekoloji vəziyyətinin yaxşılaşdırılması, sağlam həyat tərzinin və təhlükəsiz əmək şəraitinin təmin edilməsi, istehsalat zədələrinin, peşə xəstəliklərinin yayılmasının qarşısının alınmasını nəzərdə tutan tədbirlər sisteminin həyata keçirilməsi;

1.0.6. əlilliyi olan şəxslərin reabilitasiyası - əlilliyin aradan qaldırılmasına və ya kompensasiyasına yönəldilmiş tibbi, psixoloji, pedaqoji, idman, sosial-iqtisadi və digər tədbirlər sistemi vasitəsilə əlilliyi olan şəxslərin müstəqilliyinin, fiziki, əqli, məişət, sosial və peşə-əmək qabiliyyətinin tamamilə və ya qismən bərpası;

1.0.7. tibbi reabilitasiya - orqanizmin anadangəlmə, yaxud xəstəlik və ya zədə nəticəsində sonradan pozulmuş funksiyalarının bərpasına və kompensasiyasına yönəldilmiş tibbi tədbirlər sistemi;

1.0.8. peşə-əmək reabilitasiyası - əlilliyi olan şəxsin peşə seçiminə, əvvəlki və ya yeni peşədə əmək qabiliyyətinin qaytarılması məqsədi ilə zəifləmiş,

yaxud itirilmiş funksiyasının bərpa edilməsinə və ya onun yeni peşəyə uyğunlaşdırılmasına yönəldilmiş tədbirlər sistemi;

1.0.9. sosial bacarıqların inkişafı - əlilliyi olan şəxsə sosial vərdişlərin mənimsənilməsini, onlara digər şəxslərlə bərabər cəmiyyətin həyatında müstəqil iştirak etmək üçün imkanların yaradılmasını təmin edən tədbirlər sistemi;

1.0.10. psixoloji-pedaqoji reabilitasiya - əlillik xüsusiyyətinə uyğun olaraq əlilliyi olan şəxsin müxtəlif tədris metodlarından istifadə olunmaqla inklüziv və ya inteqrasiyalı təhsil almasına, ünsiyyət, özünəxidmət və öz davranışına nəzarət qabiliyyətinin bərpasına yönəldilmiş tədbirlər sistemi;

1.0.11. abilitasiya - əlilliyi olan şəxsin mövcud potensialını maksimum inkişaf *etdirmək, habelə əlilliyi olan şəxsdə olmayan bacarıqların öyrədilməsi yolu ilə*, sərbəst yaşamaq imkanlarının artırılması; [4]

1.0.12. əlilliyi olan şəxslərə müyəssərlik - iş, təhsil, səhiyyə və digər sosial mühitin, ictimai, nəqliyyat və kommersiya infrastrukturunun əlilliyi olan şəxslərin xüsusiyyətlərinə uyğunluğu;

1.0.13. ünsiyyət - dillərdən, mətndən, Brayl əlifbasından, toxunmaqla duyulan ünsiyyətdən, böyük şriftdən, mümkün multimedia vasitələrindən, eləcə də çap materiallarından, audio və video vasitələrdən, adi dildən, qiraətçilərdən, habelə mümkün informasiya-kommunikasiya texnologiyaları da daxil olmaqla, ünsiyyətin gücləndirici və alternativ üsullarından istifadə;

1.0.14. universal dizayn - əşyaların, şəraitin və xidmətlərin adaptasiya və ya xüsusi dizayn zərurəti olmadan bütün insanlar üçün istifadəyə maksimum dərəcədə yararlı dizaynı;

1.0.15. inklüziv təhsil - əlilliyi olan şəxslərin təhsil müəssisələrində *xüsusi şərait yaratmaqla və xüsusi təlim vasitəsilə* digər şəxslərlə birgə təhsili;[5]

1.0.16. əlilliyi olan şəxslərin qeyri-hökumət təşkilatı - müvafiq icra hakimiyyəti orqanı tərəfindən dövlət qeydiyyatına alınmış və əsas fəaliyyəti əlilliyi olan şəxslərin hüquqlarına və maraqlarına xidmət etmək olan ictimai birliklər və fondlar;

1.0.17. əlilliyin müəyyən edilməsi - şəxsin əlilliyinin və reabilitasiya imkanlarının qiymətləndirilməsi.

### Maddə 2. Qanunun tətbiq edildiyi şəxslər

Bu Qanun Azərbaycan Respublikasının vətəndaşlarına, Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələrdə başqa hal nəzərdə tutulmamışdırsa, Azərbaycan Respublikasının ərazisində daimi yaşayan vətəndaşlığı olmayan şəxslərə və əcnəbilərə şamil edilir.

### Maddə 3. Əlilliyin müəyyən edilməsi

3.1. Şəxsin *orqanizminin funksiyalarının pozulması faizi, səbəbi* və müddəti müvafiq icra hakimiyyəti *orqanının müəyyən etdiyi orqan (qurum)* tərəfindən onun əlilliyinin qiymətləndirilməsi keçirildikdən sonra qəbul edilmiş qərar əsasında müəyyən edilir. *Şəxsin əlilliyinin qiymətləndirilməsi, o cümlədən əlilliyin təkrar qiymətləndirilməsi onun tibbi-sosial ekspertiza müayinəsinə göndərişi müvafiq icra hakimiyyəti orqanının müəyyən etdiyi orqanın (qurumun) mərkəzləşdirilmiş elektron informasiya sisteminə daxil olduğu tarixdən 10 (on) iş günü müddətində, əlavə araşdırma tələb edildiyi*

*halda isə 15 (on beş) iş günü müddətinə uzadılmaqla keçirilir.* Əlilliyinin qiymətləndirilməsi qaydasını müvafiq icra hakimiyyəti *orqanının müəyyən etdiyi orqan (qurum)* müəyyən edir.[6]

3.2. Əlilliyin qiymətləndirilməsi məqsədi ilə tibbi-sosial ekspertiza müayinəsinə göndərişlərin verilməsi qaydasını müvafiq icra hakimiyyəti orqanı müəyyən edir.

3.3. Şəxs müvafiq icra hakimiyyəti *orqanının müəyyən etdiyi orqan (qurum)* tərəfindən bu barədə qərarın qəbul edildiyi tarixdən əlilliyi olan şəxs hesab edilir.[7]

*3.3-1. Əlillik müddəti bitdikdən sonra 6 ay ərzində əlilliyin təkrar qiymətləndirilməsi nəticəsində şəxsin əlilliyi yenidən müəyyən edildikdə, şəxs ötürülmüş müddət də daxil olmaqla, əlilliyi olan şəxs hesab edilir.*[8]

3.4. Əlilliyin müəyyən olunması meyarlarını müvafiq icra hakimiyyəti *orqanının müəyyən etdiyi orqan (qurum)* təsdiq edir.

3.5. Müvafiq icra hakimiyyəti *orqanının müəyyən etdiyi orqan (qurum)* əlilliyi olan şəxslərin vahid informasiya bazasını yaratmaq məqsədi ilə müvafiq icra hakimiyyəti orqanının apardığı elektron informasiya ehtiyatlarından istifadə etməklə əlilliyi olan şəxslərin reyestrini elektron formada aparır.

3.6. Əlilliyi olan şəxslərin reyestrinin aparılması qaydasını müvafiq icra hakimiyyəti *orqanının müəyyən etdiyi orqan (qurum)* müəyyən edir.

**Maddə 4. Əlilliyi olan şəxslərin hüquqi vəziyyətinin əsasları**

4.1. Əlilliyi olan şəxslər Azərbaycan Respublikasının Konstitusiyasında və digər normativ hüquqi aktlarda, Azərbaycan Respublikasının tərəfdar çıxdığı beynəlxalq müqavilələrdə təsbit olunmuş bütün insan və vətəndaş hüquq və azadlıqlarına malikdirlər.

4.2. Əlilliyi olan şəxslərə qarşı ayrı-seçkilik qadağandır və qanunla təqib edilir. Əlilliyi olan şəxslərin faktiki bərabərliyinin sürətləndirilməsi və ya buna nail olunması üçün zəruri olan konkret tədbirlər ayrı-seçkilik hesab edilmir.

4.3. Əlilliyi olan şəxs özü və ya nümayəndə vasitəsi ilə hüquqlarını və qanunla qorunan maraqlarını müdafiə etmək məqsədi ilə inzibati aktdan, inzibati aktın qəbul edilməsindən imtinadan, inzibati orqanın hərəkət və ya hərəkətsizliyindən "İnzibati icraat haqqında" Azərbaycan Respublikasının Qanununa uyğun olaraq şikayət edə bilər.

**Maddə 5. Əlilliyi olan şəxslər barəsində dövlət siyasətinin əsas prinsipləri**

5.0. Əlilliyi olan şəxslər barəsində dövlət siyasətinin əsas prinsipləri aşağıdakılardır:

5.0.1. əlilliyi olan şəxslərin xüsusiyyətlərinə hörmət - əlilliyi olan şəxslərin xüsusiyyətlərinə, o cümlədən *18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin* inkişaf edən qabiliyyətinə və onların öz fərdiliyini saxlamaq hüquqlarına hörmət olunması, onların insan müxtəlifliyinin komponenti və bəşəriyyətin bir hissəsi kimi qəbul edilməsi;[9]

5.0.2. inklüzivlik - *orqanizmin funksiyalarının pozulması faizindən, əlilliyin növündən və insanın həyat fəaliyyətinin məhdudlaşma* dərəcəsindən asılı olmayaraq, yaşadığı yerdə layiqli həyat sürməsi üçün iş, təhsil və digər sosial mühitin və infrastrukturun əlilliyi olan şəxsə müyəssərliyinin təmin edilməsi;[10]

5.0.3. inteqrasiya - *orqanizmin funksiyalarının pozulması faizindən, əlilliyin növündən və insanın həyat fəaliyyətinin məhdudlaşma* dərəcəsindən asılı olmayaraq əlilliyi olan şəxslərin digərləri ilə bərabər səviyyədə cəmiyyətin həyatında tam və səmərəli iştirakına şəraitin yaradılması;

5.0.4. bərabərlik - əlilliyi olan şəxslərin xidmətlərdən faydalanması və istifadəsi üçün bərabər şərtlərin və imkanların yaradılması;

5.0.5. əlillik əlamətinə görə ayrı-seçkiliyə yol verilməməsi - əlilliyi olan şəxslərin digərləri ilə qanunla bərabər səviyyədə müdafiə olunmaq və ondan bərabər istifadə etmək hüquqlarının təsbit və təmin edilməsi, əlilliklə bağlı istənilən fərqqoyma, istisna və məhdudiyyət tətbiqindən imtina olunması.

**Maddə 6. Əlilliyi olan şəxslərlə bağlı dövlət təminatları**

6.1. Dövlət əlillik əlamətinə görə hər hansı ayrı-seçkiliyə yol vermədən əlilliyi olan şəxslərə cəmiyyət həyatının bütün sahələrində iştirak etmək üçün digər şəxslərlə bərabər imkanlar, öz fərdi qabiliyyətlərinə və maraqlarına uyğun həyat sürməsi üçün lazımi şərait yaradılmasına, əlilliyə səbəb olan risklərin aradan qaldırılmasına və ya azaldılmasına, əlilliyi olan şəxslərin reabilitasiyasına və hərtərəfli inkişafına təminat verir.

6.2. Dövlət əlilliyi olan şəxslərin təhsil alması və peşə hazırlığı keçməsi üçün lazımi şərait yaradılmasına, o cümlədən ünsiyyət formalarından istifadənin mənimsənilməsinə və əlilliyi olan şəxslərin təhsilinin “Təhsil haqqında” Azərbaycan Respublikasının Qanuna uyğun olaraq, onlar üçün uyğun dildə və üsullarla həyata keçirilməsinə təminat verir.

6.3. Dövlət əlilliyi olan şəxslərin işgəncələrə və digər qəddar, qeyri-insani və ya ləyaqəti alçaldan rəftar və cəzalara məruz qalmamasına, onların yaşayış yerində və yaşayış yerindən kənarda istismarın, zorakılığın, təhqirin bütün formalarından müdafiəsinə, şəxsi həyatının toxunulmazlığına təminat verir.

6.4. Əlilliyi olan şəxslərin hüquq və qanuni mənafelərini inzibati qaydada və məhkəmə qaydasında müdafiə etmək hüququ vardır.

6.5. Dövlət əlilliyi olan şəxslərin qeyri-hökumət təşkilatlarına bu Qanunla müəyyən edilmiş hüquqlarını həyata keçirmək üçün şərait yaradılmasına təminat verir.

**Maddə 7. İctimai maarifləndirmə**

7.0. Müvafiq icra hakimiyyəti orqanları əlilliklə bağlı məsələlərə dair cəmiyyətin ümumi maariflənmə səviyyəsini yüksəltmək, əlilliyi olan şəxslərin hüquq və ləyaqətinə hörmət olunmasını möhkəmləndirmək, onların potensial imkan və qabiliyyətlərini təbliğ etmək məqsədi ilə aşağıdakı istiqamətlərdə tədbirlər həyata keçirirlər:

7.0.1. əlilliyi olan şəxslərə hörmətlə yanaşmanın tərbiyə olunması;

7.0.2. əlilliyi olan şəxslər haqqında müsbət təsəvvürlərin təşviqi;

7.0.3. əlilliyi olan şəxslərin peşə vərdişlərinin və qabiliyyətlərinin tanınmasına köməklik göstərilməsi;

7.0.4. təhsilin bütün pillələrində, o cümlədən erkən yaşlardan başlayaraq uşaqlarda əlilliyi olan şəxslərin hüquqlarına hörmət edilməsinin tərbiyə olunması;

7.0.5. əlilliyi olan şəxslərə və onların hüquqlarına həsr edilən tərbiyəvi-tanışlıq proqramlarının inkişaf etdirilməsi.

## 2-ci fəsil
## ƏLİLLİYİ OLAN ŞƏXSLƏRİN REABİLİTASİYASI, ABİLİTASİYASI VƏ İNKİŞAFI

### Maddə 8. Sağlam həyat tərzinin təmin edilməsi

8.1. Dövlət əlilliyin qarşısını almaq məqsədi ilə cəmiyyətin əsas nailiyyəti kimi sağlam həyat tərzinin təbliğini təmin edir.

8.2. İnsanların fiziki və ruhi sağlamlığının mühafizəsi, onların fəal uzunömürlüyünün artırılması, tibbi yardımla təminatı "Əhalinin sağlamlığının qorunması haqqında" Azərbaycan Respublikasının Qanunu ilə tənzimlənir.

8.3. Müvafiq icra hakimiyyəti *orqanının müəyyən etdiyi orqan (qurum)* tərəfindən müəyyən edilmiş tibbi xidmət növləri istisna olmaqla, dövlət tibb müəssisələrində əlilliyi olan şəxslər üçün müvafiq icra hakimiyyəti *orqanının müəyyən etdiyi orqanın (qurumun)* göndərişi ilə tibbi xidmət dövlət büdcəsi hesabına həyata keçirilir.[11]

8.4. Əlilliyi olan şəxslərin bədən tərbiyəsi və idman sahəsində təminatları "Bədən tərbiyəsi və idman haqqında" Azərbaycan Respublikasının Qanunu ilə müəyyən edilir.

### Maddə 9. Uşaqlar arasında sağlamlıq üzrə profilaktik tədbirlər

9.1. Uşaqlarda əqli inkişafın gizli *pozuntularını*, hiss üzvlərinin, hərəkət sisteminin pozulmalarını erkən aşkar etmək, onların sağlamlıq vəziyyətini dinamik müşahidə etmək və *əlillik* səviyyəsini azaltmaq məqsədi ilə "Uşaqların icbari dispanserizasiyası haqqında" Azərbaycan Respublikasının Qanunu ilə müəyyən edilmiş qaydada icbari dispanserizasiyası həyata keçirilir.[12]

9.2. Səhhətində fiziki, yaxud əqli inkişafında hər hansı pozulma riski və ya halı olan uşaqlara dövlət tərəfindən lazımi tibbi, pedaqoji, psixoloji, hüquqi, sosial və digər yardım göstərilir. Bu cür yardımın metodları, forması, həcmi və müddəti bu Qanunun 11-ci maddəsinə uyğun olaraq tərtib edilmiş Fərdi Reabilitasiya Proqramı ilə müəyyən edilir.

### Maddə 10. Əlilliyi olan şəxslərin reabilitasiyası və abilitasiyası

10.1. Dövlət əlilliyi olan şəxslərə maksimum müstəqilliyə, fiziki, əqli, sosial və peşəkar qabiliyyətlərə nail olmaq və bunları qoruyub saxlamaq imkanı verir.

10.2. Əlilliyi olan şəxslərin reabilitasiyası bu Qanunun 11-ci maddəsinə uyğun tərtib edilmiş Fərdi Reabilitasiya Proqramı əsasında müvafiq icra hakimiyyəti orqanı tərəfindən təmin edilir.

10.3. Əlilliyi olan şəxslərin reabilitasiyası və inkişafı onların Fərdi Reabilitasiya Proqramına uyğun olaraq yaşayış yerində (Fərdi Reabilitasiya Proqramına uyğun olaraq reabilitasiya zərurəti olan digər ərazidə), iş yerində, təhsil aldıqları yerlərdə, reabilitasiya müəssisələrində və digər reabilitasiya subyektlərində həyata keçirilir.

10.4. Dövlət reabilitasiya müəssisələrinin təşkili və fəaliyyəti qaydasını müvafiq icra hakimiyyəti orqanı müəyyən edir.

10.5. Özəl və bələdiyyə reabilitasiya subyektləri üçün standartlar müvafiq icra hakimiyyəti orqanı tərəfindən təsdiq edilir.

10.6. Əlilliyi olan şəxslərin abilitasiyası müvafiq icra hakimiyyəti orqanının müəyyən etdiyi qaydada müvafiq icra hakimiyyəti orqanı tərəfindən həyata keçirilir.

### Maddə 11. Fərdi Reabilitasiya Proqramı

11.1. Əlilliyi olan şəxslərin tibbi, peşə-əmək, psixoloji-pedaqoji reabilitasiyası və sosial bacarıqların inkişafı məqsədi ilə Fərdi Reabilitasiya Proqramı tərtib olunur.

11.2. Fərdi Reabilitasiya Proqramının hazırlanması, təsdiq edilməsi və həyata keçirilməsi qaydasını müvafiq icra hakimiyyəti orqanı müəyyən edir.

11.3. Fərdi Reabilitasiya Proqramı əlilliyi olan şəxsin və (və ya) onun qanuni nümayəndəsinin iştirakı ilə müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən edilir.

11.4. Uşaqların erkən, habelə sonrakı yaş dövrlərində sosial-psixoloji qiymətləndirilməsinin aparılması, inkişaf xüsusiyyətlərini aşkarlamaqla, *18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərə* və onların qanuni nümayəndələrinə zəruri məsləhətlərin verilməsi müvafiq icra hakimiyyəti orqanı tərəfindən həyata keçirilir. Müvafiq icra hakimiyyəti orqanının işində *18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin* qanuni nümayəndəsinin iştirakı təmin edilir.[13]

11.5. Dövlət *orqanları və dövlətə məxsus hüquqi şəxslər* Fərdi Reabilitasiya Proqramının icrasını təmin etməlidirlər. [14]

## 3-cü fəsil
## ƏLİLLİYİ OLAN ŞƏXSLƏR ÜÇÜN MÜYƏSSƏRLİK

### Maddə 12. Müyəssərlik üçün şərait yaradılması

Dövlət əlilliyi olan şəxslərə müstəqil həyat tərzi keçirmək və həyatın bütün aspektlərində hərtərəfli iştirak etmək imkanının yaradılması üçün, onların digərləri ilə bərabər səviyyədə fiziki mühit, nəqliyyat, informasiya və rabitədən, o cümlədən informasiya-kommunikasiya texnologiyaları və sistemlərindən, əhaliyə açıq olan və ya təqdim olunan digər obyekt və xidmətlərdən istifadəsinin təmin olunması üçün zəruri tədbirlər görür.

### Maddə 13. İnfrastruktur obyektlərinin layihələndirilməsi və tikintisi zamanı əlilliyi olan şəxslərin tələbatının nəzərə alınması

13.1. Azərbaycan Respublikasının ərazisində və yaşayış məntəqələrində infrastruktur obyektlərinin Azərbaycan Respublikasının Şəhərsalma və Tikinti Məcəlləsinə uyğun olaraq layihələndirilməsi və tikintisi zamanı universal dizayn əsasında bu obyektlərin əlilliyi olan şəxslərə maneəsiz müyəssər olması~~, onların infrastrukturlardan sərbəst istifadə etməsi üçün ağlabatan uyğunlaşma~~ təmin edilir.[15]

13.2. Universal dizaynla bağlı tikinti texniki normaları Azərbaycan Respublikasının Şəhərsalma və Tikinti Məcəlləsinə uyğun olaraq hazırlanan şəhərsalma və tikintiyə dair normativ sənədlərdə nəzərdə tutulur.

13.3. Müvafiq icra hakimiyyəti orqanı bu Qanunun 13.2-ci maddəsində göstərilən universal dizaynla bağlı tikinti texniki normalarının hazırlanmasında

“Normativ hüquqi aktlar haqqında” Azərbaycan Respublikasının Konstitusiya Qanununa uyğun olaraq iştirak edir.

13.4. “Yol hərəkəti haqqında” Azərbaycan Respublikasının Qanununa uyğun olaraq təşkil edilən parklanma yerlərinin 5 faizi (bir parklanma yerindən az olmayaraq) əlilliyi olan şəxslər üçün ayrılır. Əlilliyi olan şəxslər üçün ayrılan parklanma yerlərində yalnız *“əlilliyi olan şəxs” tanınma* nişanı ilə nişanlanmış nəqliyyat vasitələri dura bilərlər. [16]

**Maddə 14. İnfrastruktur obyektlərinin əlilliyi olan şəxslərin istifadəsi üçün uyğunlaşdırılması**

14.1. Müvafiq icra hakimiyyəti orqanları, müəssisələr və təşkilatlar tabeliklərində olan yol-nəqliyyat, rabitə, informasiya, mədəniyyət, məişət və digər sosial infrastruktur obyektlərini əlilliyi olan şəxslərin istifadəsi üçün ağlabatan uyğunlaşdırırlar.

14.2. Bu Qanunun 14.1-ci maddəsində göstərilən infrastruktur obyektlərinin əlilliyi olan şəxslərin istifadəsi üçün ağlabatan uyğunlaşdırılması qaydasını müvafiq icra hakimiyyəti orqanı müəyyən edir.

**Maddə 15. Yaşayış binalarının əlilliyi olan şəxslərin istifadəsi üçün uyğunlaşdırılması**

15.1. Yaşayış binaları, pilləkənlər, pilləkən qəfəsləri, çıxış və girişlər, dəhlizlər, açıq keçidlər, rampalar, liftlər, əlilliyi olan şəxslərin yaşadıqları mənzillərin giriş qapıları əlilliyi olan şəxslərin rahat və təhlükəsiz hərəkəti üçün ~~ağlabatan~~ uyğunlaşdırılır.[17]

15.2. Bu Qanunun 15.1-ci maddəsində göstərilən obyektlərin əlilliyi olan şəxslər üçün ~~ağlabatan~~ uyğunlaşdırılması həmin obyektlərin sifarişçisi tərəfindən həyata keçirilir.

15.3. İstehsalatda bədbəxt hadisələr və peşə xəstəlikləri nəticəsində əlilliyi olan şəxslər istisna olmaqla, əlilliyi olan şəxslərin yaşadıqları fərdi evlərin onlar üçün uyğunlaşdırılması onların vəsaiti hesabına təmin edilir.

15.4. İstehsalatda bədbəxt hadisələr və peşə xəstəlikləri nəticəsində əlilliyi olan şəxslər üçün onların yaşadığı fərdi evlərin uyğunlaşdırılması ilə bağlı xərclər təqsirkar hüquqi və fiziki şəxslər, dövlət orqanları tərəfindən ödənilir. Həmin xərclərin minimum məbləği müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən edilir.

**Maddə 16. Mədəniyyət və idman obyektlərinin əlilliyi olan şəxslərə müyəssərliyinin təmin edilməsi**

16.1. Müvafiq icra hakimiyyəti orqanları mədəniyyət müəssisələrinin və idman qurğularının əlilliyi olan şəxslərə müyəssər olması üçün lazımi şəraiti təmin edirlər.

16.2. Əlilliyi olan şəxslərin “Mədəniyyət haqqında” Azərbaycan Respublikasının Qanununa uyğun olaraq, mədəniyyət müəssisələri tərəfindən göstərilən xidmətlərdən güzəştli istifadəsi təmin edilir.

16.3. Əlilliyi olan şəxslər “Bədən tərbiyəsi və idman haqqında” Azərbaycan Respublikasının Qanununa uyğun olaraq, dövlət və bələdiyyə

bədən tərbiyəsi-idman təşkilatlarının bədən tərbiyəsi-idman xidmətlərindən pulsuz ~~və güzəştli şərtlərlə~~ istifadə edirlər. [18]

**Maddə 17. İnfrastruktur obyektlərinin və yaşayış binalarının əlilliyi olan şəxslərə müyəssər olmasına dövlət nəzarəti**

İnfrastruktur obyektlərinin və yaşayış binalarının layihələndirilməsi və tikintisi zamanı əlilliyi olan şəxslərin tələbatının nəzərə alınmasına, istismarda olan infrastruktur obyektlərinin və yaşayış binalarının əlilliyi olan şəxslərin istifadəsi üçün ağlabatan uyğunlaşdırılmasına müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən olunmuş qaydada müvafiq icra hakimiyyəti orqanı nəzarət edir.

## 4-cü fəsil
## ƏLİLLİYİ OLAN ŞƏXSLƏRİN TƏHSİLİ

**Maddə 18. *Sağlamlıq imkanları məhdud uşaqların* məktəbəqədər və məktəbdənkənar təlim və tərbiyəsi**[19]

*18.1. 18 yaşınadək əlilliyi müəyyən edilmiş məktəbəqədər yaşda olan uşaqların təlim və tərbiyəsi bu Qanunun 11-ci maddəsinə əsasən təsdiq edilmiş Fərdi Reabilitasiya Proqramı nəzərə alınmaqla həyata keçirilir.*[20]

18.2. Məktəbəqədər təhsil müəssisələrində *18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin* təlim və tərbiyəsi "Məktəbəqədər təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu ilə tənzimlənir.[21]

18.3. Müvafiq icra hakimiyyəti orqanları *18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxsləri* hərtərəfli və ahəngdar inkişaf etdirmək, əməyə, elmə, texnikaya, incəsənətə və idmana cəlb etmək, onlarda ictimai fəallıq oyatmaq məqsədi ilə onların məktəbdənkənar tərbiyəsi üçün lazımi şəraitin yaradılmasını təmin edirlər.[22]

**Maddə 19. *18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin* stasionar müəssisələrdə olduqları dövrdə təlim və tərbiyəsi**[23]

19.1. Stasionar müalicə-profilaktika və ya reabilitasiya müəssisələrində müalicə kursu keçən *18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin* həmin müəssisələrdə olduqları dövrdə fasiləsiz təhsilini təmin etmək üçün müvafiq icra hakimiyyəti *orqanının müəyyən etdiyi orqan (qurum) tərəfindən "Sağlamlıq imkanları məhdud şəxslərin təhsili (xüsusi təhsil) haqqında" Azərbaycan Respublikası Qanununun 10-cu maddəsinə uyğun olaraq* dərs məşğələləri təşkil olunur. [24]

~~19.2. Stasionar müalicə-profilaktika və ya reabilitasiya müəssisələrində dərs məşğələlərinin təşkili qaydasını müvafiq icra hakimiyyəti orqanı müəyyən edir.~~ [25]

**Maddə 20. Əlilliyi olan şəxslərin təhsili və peşə hazırlığı**

20.1. Əlilliyi olan şəxslərin təhsili və peşə hazırlığı Azərbaycan Respublikasının "Təhsil haqqında"*, "Ümumi təhsil haqqında", "Peşə təhsili*

*haqqında”* və “Sağlamlıq imkanları məhdud şəxslərin təhsili (xüsusi təhsil) haqqında” qanunları ilə tənzimlənir.[26]

20.2. Əlilliyi olan şəxslərin təhsili və peşə hazırlığı xüsusi və (və ya) inklüziv təhsil formasında, xüsusi təhsil proqramları və fərdi *tədris planı* əsasında həyata keçirilir. Xüsusi şərait yaradılmadan əlilliyi olan şəxslərin təhsil almasında çətinliklər yaranan hallarda onların təhsili evdə təhsil, fərdi təhsil və distant təhsil formasında həyata keçirilir. [27]

*20.3. Müvafiq icra hakimiyyəti orqanının müəyyən etdiyi orqanda (qurumda) işaxtaran və (və ya) işsiz kimi qeydiyyata alınmış və 18 yaşı tamam olmuş əlilliyi olan şəxslərin peşə hazırlığı həmin orqanın göndərişi əsasında bu Qanunun 11-ci maddəsinə əsasən təsdiq olunmuş Fərdi Reabilitasiya Proqramına və “Məşğulluq haqqında” Azərbaycan Respublikasının Qanununa uyğun olaraq təmin edilir.*[28]

20.4. Əlilliyi olan şəxslər dövlət təhsil müəssisələrində təhsil və peşə hazırlığı üçün zəruri olan tədris vəsaiti və texniki ləvazimatla, o cümlədən fərdi tələbatı nəzərə alan vasitələrlə dövlət hesabına təmin edilirlər.

20.5. Dövlət əlilliyi olan şəxslərin təhsili və peşə hazırlığı üçün pedaqoji kadrların, psixoloqların, sosial işçilərin və digər mütəxəssislərin hazırlanmasını təmin edir.

20.6. Dövlət əlilliyi olan şəxslərin təhsilini və peşə hazırlığını təmin etmək üçün pedaqoji işçilərin bu işə cəlb olunması və ünsiyyətin gücləndirici və alternativ üsullarından, tədris metodikası və materiallardan istifadəsi üçün lazımi tədbirlər görür.

*20.7. Əlilliyi olan şəxslərin dövlət peşə təhsili müəssisələrində ödənişli əsaslarla təhsil aldıqları müddətdə təhsil haqqı dövlət büdcəsinin vəsaiti hesabına ödənilir.*[29]

## 5-ci fəsil
## ƏLİLLİYİ OLAN ŞƏXSLƏRİN MƏŞĞULLUĞU

### Maddə 21. Əlilliyi olan şəxslərin əmək hüququnun həyata keçirilməsi

21.1. Əlilliyi olan şəxslərin digər şəxslərlə bərabər səviyyədə əmək fəaliyyəti ilə məşğul olmaq, o cümlədən açıq, inklüziv və müyəssər iş şəraitində sərbəst seçdiyi və ya qəbul etdiyi əmək bazarında iştirak etməklə öz yaşayışını təmin etmək hüququ vardır.

21.2. Əmək münasibətlərində əlillik əlamətinə görə hər hansı ayrı-seçkiliyə yol verilməsi, habelə kollektiv və əmək müqavilələrində digər işçilərlə münasibətdə əlilliyi olan şəxslərin əmək hüquqlarının məhdudlaşdırlması qadağandır.

21.3. Əlilliyi olan şəxsin səhhətinin peşə vəzifələrini yerinə yetirməsinə mane olduğu, yaxud başqa şəxslərin səhhəti və əmək təhlükəsizliyi üçün təhlükə törətdiyi hallar istisna olmaqla, onunla əlillik səbəbindən əmək müqaviləsini bağlamaqdan, işdə irəli çəkməkdən imtina edilməsinə, əmək müqaviləsinə xitam verilməsinə və öz razılığı olmadan başqa işə (peşə, vəzifə) keçirilməsinə yol verilmir.

21.4. Müəssisənin ləğv edilməsi halları istisna olmaqla, müddətindən asılı olmayaraq, reabilitasiya müəssisəsində və digər reabilitasiya subyektlərində

müalicə keçən əlilliyi olan şəxslərlə bağlanılmış əmək müqaviləsinin işəgötürən tərəfindən ləğv edilməsinə yol verilmir.

**Maddə 22. Əlilliyi olan şəxslərin məşğulluğunun təmin edilməsi**

22.1. Dövlət əmək bazarında əlavə iş yerləri və əlilliyi olan şəxslər üçün uyğun şəraitə malik müəssisə və təşkilatlar yaratmaq yolu ilə, eləcə də xüsusi proqramlar üzrə təlim təşkil etməklə, əlilliyi olan şəxslərin məşğulluğunu təmin edir.

22.2. "Məşğulluq haqqında" Azərbaycan Respublikasının Qanununa uyğun olaraq, əlilliyi olan şəxsləri işlə təmin etmək üçün müəssisə və təşkilatlarda kvota müəyyən edilir.

22.3. Bu Qanunun 22.2-ci maddəsinə əsasən kvota müəyyən edilmiş iş yerlərinə əlilliyi olan şəxslər müvafiq icra hakimiyyəti orqanının göndərişi ilə işə qəbul edilirlər.

22.4. Bu Qanunun 22.3-cü maddəsinə əsasən işə düzəlmək üçün əlilliyi olan şəxslərə verilmiş göndəriş, müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən edilmiş kvota şamil edilməyən müəssisələr istisna olmaqla, mülkiyyət növündən və təşkilati hüquqi formasından asılı olmayaraq müəssisə və təşkilatlar tərəfindən qəbul edilməlidir.

22.5. Müvafiq icra hakimiyyəti orqanı tərəfindən göndərilmiş əlilliyi olan şəxsləri onlar üçün kvota üzrə müəyyən olunmuş iş yerlərinə qəbul etməyən işəgötürənlər qanunla müəyyən edilmiş məsuliyyət daşıyırlar.

**Maddə 23. İş yerlərinin əlilliyi olan şəxslərə müyəssər olması və istifadəsi üçün ağlabatan uyğunlaşdırılması**

23.1. Bu Qanunun 22.3-cü maddəsinə əsasən müvafiq icra hakimiyyəti orqanı tərəfindən göndərilmiş, habelə işəgötürənlər tərəfindən işə qəbul edilmiş əlilliyi olan şəxslər bu Qanunun 11-ci maddəsinə uyğun olaraq təsdiq edilmiş Fərdi Reabilitasiya Proqramı və bu Qanunun 23.2-ci maddəsində müəyyən olunmuş əlilliyi olan şəxslərin iş yerlərinin standartları nəzərə alınaraq iş yerləri ilə təmin olunurlar.

23.2. Əlilliyi olan şəxslərin iş yerlərinin standartları müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən edilir.

**Maddə 24. İşəgötürənlərin istehsalatda bədbəxt hadisələr və ya peşə xəstəlikləri nəticəsində əlilliyi olan şəxsləri işə düzəltmək vəzifəsi**

24.1. İşəgötürənlər həmin istehsalatda bədbəxt hadisələr nəticəsində əmək qabiliyyətini itirmiş və ya peşə xəstəliyinə tutulmuş və bunun nəticəsində əlilliyi olan işçilərin, onların arzusu ilə və bu Qanunun 11-ci maddəsinə uyğun olaraq təsdiq edilmiş Fərdi Reabilitasiya Proqramını nəzərə alaraq, işə düzəlməsi üçün iş yerləri ayırmağa və ya yenilərini təşkil etməyə borcludurlar.

24.2. Bu Qanunun 24.1-ci maddəsində göstərilən əlilliyi olan şəxslərin iş yerlərinin onların istifadəsi üçün uyğunlaşdırılması məqsədi ilə işəgötürən əlilliyi olan şəxslərin iş yerlərindən istifadə imkanlarını asanlaşdıran texniki avadanlıq və qurğuların alınması, mövcud olan texniki avadanlıq və qurğuların əlilliyi olan şəxslərin tələbatına uyğunlaşdırılması, ixtisaslaşmış vasitəçilərin xidmətləri ilə təmin edilməsi kimi ağlabatan tədbirlər həyata keçirir.

24.3. İşçilərin sayı və ya ştatları ixtisar edilərkən, müvafiq peşələr (vəzifələr) üzrə işçilərin ixtisasları (peşələri) və ya peşəkarlıq səviyyələri eyni olduqda, həmin müəssisədə istehsalat qəzası və ya peşə xəstəliyi nəticəsində əlilliyi olan şəxsin işdə saxlanılmaq üçün üstünlük hüququ vardır.

24.4. Müəssisənin ləğv edilməsi halları istisna olmaqla, bu Qanunun 24.1-ci maddəsində göstərilən işçi ilə əmək müqaviləsinin işəgötürən tərəfindən ləğv edilməsi qanunla müəyyən edilmiş məsuliyyətə səbəb olur.

24.5. İstehsalatda bədbəxt hadisələr və ya peşə xəstəliyi nəticəsində işləməyən *orqanizmin funksiyalarının 61-100 faiz pozulmasına görə əlilliyi müəyyən edilmiş* şəxslərin "Əmək pensiyaları haqqında" Azərbaycan Respublikasının Qanununa əsasən yaşa görə əmək pensiyasının təyin edilməsi üçün yaş həddinə çatanadək pensiyada olduqları müddət onların sığorta stajına daxil edilir. [30]

### Maddə 25. Əlilliyi olan şəxslərin əmək şəraiti

25.1. İşəgötürənlər əlilliyi olan şəxsləri sağlam, təhlükəsiz və bu Qanunun 11-ci maddəsində göstərilən Fərdi Reabilitasiya Proqramına uyğun əmək şəraiti ilə təmin edir, əmək qabiliyyətinin bərpa olunması, iş yerində əlilliyin qarşısının alınması üçün tədbirlər həyata keçirirlər.

25.2. Əlilliyi olan işçilərin əməyinin tətbiqi, əmək şəraitinin xüsusiyyətləri, əməkhaqqı, iş və istirahət vaxtı, məzuniyyət müddəti və əmək münasibətlərinin bu Qanunda tənzimlənməyən digər məsələləri Azərbaycan Respublikasının Əmək Məcəlləsi ilə tənzimlənir.

### Maddə 26. Əlilliyi olan şəxslərin fərdi əməyi və sahibkarlıq fəaliyyəti

Dövlət əlilliyi olan şəxslərin fərdi əmək və sahibkarlıq fəaliyyəti ilə məşğul olması, evdə əməyin təşkili üçün lazımi şərait yaradır, iqtisadi fəaliyyətlərinin genişləndirilməsi məqsədi ilə stimullaşdırıcı tədbirlər həyata keçirir, ədalətli və əlverişli əmək şəraitinə dair hüquqlarının digər şəxslərlə bərabər qorunmasına zəmanət verir.

## 6-cı fəsil
## ƏLİLLİYİ OLAN ŞƏXSLƏRİN SOSİAL MÜDAFİƏSİ

### Maddə 27. Layiqli həyat səviyyəsi və sosial müdafiə

27.0. Dövlət əlilliyi olan şəxslərin və onların ailələrinin qidalanma, geyim və yaşayış yeri daxil edilməklə layiqli həyat səviyyəsinin, həyat şəraitinin yaxşılaşdırılmasının təmin və təşviq edilməsi üçün aşağıdakı tədbirləri həyata keçirir:

27.0.1. əlilliyi olan şəxslərin əlilliklə bağlı ehtiyaclarının ödənilməsi üçün köməklik göstərir;

27.0.2. əlilliyi olan şəxslərin sosial müdafiə və yoxsulluğun azaldılması üzrə dövlət proqramlarından istifadə etmək imkanlarını təmin edir.

### Maddə 28. Əlilliyi olan şəxslərin sosial təminatı

28.1. Əlilliyi olan şəxslərə əmək pensiyasının təyin edilməsi şərtləri və qaydası “Əmək pensiyaları haqqında” Azərbaycan Respublikasının Qanunu ilə müəyyən edilir.
28.2. Əlilliyi olan şəxslərə sosial müavinət təyin edilməsi şərtləri və qaydası “Sosial müavinətlər haqqında” Azərbaycan Respublikasının Qanunu ilə müəyyən edilir.
28.3. Müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən edilmiş hallarda əlilliyi olan şəxslərə təqaüd verilir.

**Maddə 29. Əlilliyi olan şəxslərin tibbi təminatı**

Əlilliyi olan şəxslər müvafiq icra hakimiyyəti orqanının müəyyən etdiyi qaydada dərman preparatları, tibbi xidmət, ölkə hüdudları daxilində sanatoriya-kurort müalicəsi, həmçinin protez-ortopediya məmulatları, diş protezləri (qiymətli metallardan hazırlanan protezlər istisna olmaqla) ilə təmin olunurlar.

**Maddə 30. Əlilliyi olan şəxslərə reabilitasiya vasitələrinin verilməsi**

30.1. Əlilliyi olan şəxslərin reabilitasiya vasitələri ilə təmin edilməsi müvafiq icra hakimiyyəti orqanının təsdiq etdiyi reabilitasiya vasitələrinin növlərinin siyahısına əsasən dövlət büdcəsi hesabına həyata keçirilir.
30.2. Əlilliyi olan şəxslərin bu Qanunun 30.1-ci maddəsində göstərilən reabilitasiya vasitələri ilə təmin edilməsi şərtləri və qaydası müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən olunur.
30.3. Bu Qanunun 30.1-ci maddəsində göstərilən reabilitasiya vasitələrinin texniki normativ hüquqi aktlara uyğunluğuna nəzarət və onların əlilliyi olan şəxslərə yaşayış yeri üzrə verilməsi müvafiq icra hakimiyyəti orqanı tərəfindən həyata keçirilir.

**Maddə 31. Əlilliyi olan şəxslərin mənzil təminatı**

31.1. Əlilliyi olan şəxsin yaşayış sahəsinə ehtiyacı olan hesab edilməsinin əsasları və yaşayış sahəsinə ehtiyacı olan qismində uçota alınması qaydaları Azərbaycan Respublikasının Mənzil Məcəlləsi ilə müəyyən edilir.
31.2. Yaşayış sahəsinə ehtiyacı olan şəxs qismində uçota alınmış əlilliyi olan şəxs vəfat etdiyi halda həmin uçot onun ailə üzvləri üçün müvafiq icra hakimiyyəti orqanı tərəfindən müəyyən olunmuş qaydada saxlanılır.

**Maddə 32. Əlilliyi olan şəxslərə sosial xidmət göstərilməsi**

32.1. Əlilliyi olan şəxslərə sosial xidmət göstərilməsi qaydası və şərtləri “Sosial xidmət haqqında” Azərbaycan Respublikasının Qanunu ilə tənzimlənir.
32.2. Əlilliyi olan şəxslərin sosial xidmət müəssisələrində olması onların öz hüquqlarını və azadlıqlarını həyata keçirmək imkanını təmin edir və şəxsiyyətin tələbatının maksimum ödənilməsinə kömək göstərir.
32.3. Sosial xidmət müəssisələrində yaşayan valideynlərini itirmiş və valideyn himayəsindən məhrum olmuş *18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslər* yetkinlik yaşına çatdıqda, müvafiq icra hakimiyyəti orqanın rəyinə

əsasən özlərinə xidmət edə və müstəqil yaşaya bilərlərsə növbədənkənar mənzil almaq hüququna malikdirlər.[31]

***Maddə 32-1. Əlilliyi olan şəxslərin sosial müdafiəsi və sosial təminatı sahələrində xidmətlərin elektron qaydada həyata keçirilməsi***[32]

*Əlilliyi olan şəxslərin sosial müdafiəsi və sosial təminatı sahələrində elektron xidmətlər müvafiq icra hakimiyyəti orqanının mərkəzləşdirilmiş elektron informasiya sistemi vasitəsilə həyata keçirilir.*

## 7-ci fəsil
## ƏLİLLİYİ OLAN ŞƏXSLƏRİN SİYASİ HƏYATDA VƏ ƏDALƏT MÜHAKİMƏSİNDƏ İŞTİRAKI

### Maddə 33. Siyasi və ictimai həyatda iştirak

33.1. Əlilliyi olan şəxslərin Azərbaycan Respublikası Konstitusiyasının 56-cı maddəsinə və Azərbaycan Respublikasının Seçki Məcəlləsinə uyğun olaraq, dövlət orqanlarına seçmək və seçilmək, habelə referendumda iştirak etmək hüququ vardır.

33.2. Azərbaycan Respublikasının Seçki Məcəlləsinə uyğun olaraq, seçkilərin (referendumun) təşkili və keçirilməsi zamanı səs vermək üçün xüsusi şəraitin yaradılması tələb olunan əlilliyi olan şəxslərin seçkilərdə (referendumda) iştirakı üçün bütün imkanlar yaradılır.

33.3. Siyasi partiyaların, qeyri-hökumət təşkilatlarının, həmkarlar ittifaqlarının nizamnamələri həmin təşkilatların fəaliyyətində əlilliyi olan şəxslərin iştirakını məhdudlaşdırmamalıdır.

33.4. Əlilliyi olan şəxslərin qeyri-hökumət təşkilatı "Qeyri-hökumət təşkilatları (ictimai birliklər və fondlar) haqqında" Azərbaycan Respublikasının Qanununa uyğun olaraq yaradılır.

### Maddə 34. Əlilliyi olan şəxslərin ədalət mühakiməsində təminatı

İnzibati icraatda və məhkəmə icraatında iştirak edən və ixtisaslaşmış vasitəçilərin köməyinə ehtiyacı olan əlilliyi olan şəxslər ixtisaslaşmış vasitəçilərin (qiraətçilərin və peşəkar surdo tərcüməçiləri) xidmətləri ilə təmin edilirlər.

## 8-ci fəsil
## YEKUN MÜDDƏALAR

### Maddə 35. Əlilliyi olan şəxslərin hüquqlarının həyata keçirilməsi ilə bağlı tədbirlərin maliyyələşdirilməsi

35.1. Əlilliyi olan şəxslərin hüquqlarının həyata keçirilməsi ilə bağlı tədbirlər dövlət, yerli özünüidarəetmə orqanları və qanunda nəzərdə tutulmuş digər mənbələr hesabına maliyyələşdirilir.

35.2. Dövlət büdcəsinin vəsaiti hesabına həyata keçirilməsi nəzərdə tutulan tədbirlərin maliyyələşdirilməsi müvafiq icra hakimiyyəti orqanlarına ayrılan büdcə təxsisatları daxilində həyata keçirilir.

**Maddə 36. Statistika və məlumatların toplanılması**

36.1. Əlilliklə bağlı məlumatların, o cümlədən ilkin statistik məlumatların toplanılması müvafiq icra hakimiyyəti orqanları tərəfindən həyata keçirilir.

36.2. Əlilliklə bağlı məlumatların toplanılması, saxlanılması, istifadəsi və yayılması zamanı insan və vətəndaş hüquqları və azadlıqlarının müdafiəsinə dair qəbul edilmiş beynəlxalq normalara, "Fərdi məlumatlar haqqında", "Rəsmi statistika haqqında", "İnformasiya əldə etmək haqqında" və "Məlumat azadlığı haqqında" Azərbaycan Respublikası qanunlarının tələblərinə əməl edilməlidir.

36.3. Bu Qanunun 36-cı maddəsinə uyğun olaraq toplanılmış məlumatlardan əlilliyi olan şəxslərin hüquqlarının həyata keçirilməsi zamanı qarşılaşdıqları maneələrin müəyyən edilməsi və aradan qaldırılması üçün istifadə edilir.

36.4. Əlilliklə bağlı fərdi məlumatların mühafizəsinin təmin olunmaması qanunla müəyyən edilmiş məsuliyyətə səbəb olur.

**Maddə 37. Beynəlxalq əməkdaşlıq**

Dövlət beynəlxalq əməkdaşlığın, o cümlədən beynəlxalq inkişaf proqramlarının əlilliyi olan şəxsləri əhatə etməsi və onlar üçün müyəssər olması, beynəlxalq əməkdaşlıq çərçivəsində informasiya, təcrübə və qabaqcıl layihələrin mübadiləsi yolu ilə mövcud imkanların genişləndirilməsi, tədqiqat sahəsində əməkdaşlığa yardım göstərilməsi istiqamətində zəruri və effektiv tədbirlər həyata keçirir.

**Maddə 38. Əlilliyi olan şəxslərin hüquqları sahəsində dövlət monitorinqi**

38.1. Əlilliyi olan şəxslərin hüquqları sahəsində dövlət monitorinqinin məqsədi bu sahədə dövlət siyasətinin həyata keçirilməsinin cari vəziyyətinin öyrənilməsi, çatışmazlıqların və həyata keçiriləcək dövlət siyasəti istiqamətlərinin və tədbirlərin müəyyən edilməsidir.

38.2. Əlilliyi olan şəxslərin hüquqları sahəsində dövlət monitorinqi müvafiq icra hakimiyyəti orqanının müəyyən etdiyi qaydada müvafiq icra hakimiyyəti orqanı tərəfindən həyata keçirilir.

38.3. Əlilliyi olan şəxslər və onları təmsil edən ixtisaslaşmış qeyri-hökumət təşkilatları əlilliyi olan şəxslərin hüquqları sahəsində dövlət monitorinqi prosesində iştirak edə bilərlər.

**Maddə 39. Qanunun pozulmasına görə məsuliyyət**

Bu Qanunun tələblərinin pozulmasında təqsirkar olan şəxslər Azərbaycan Respublikasının Cinayət Məcəlləsinə, Azərbaycan Respublikasının Mülki Məcəlləsinə və Azərbaycan Respublikasının İnzibati Xətalar Məcəlləsinə uyğun məsuliyyət daşıyırlar.

**Maddə 40. Qanunun qüvvəyə minməsi**

Bu Qanun qüvvəyə mindiyi gündən “Əlilliyin və uşaqların sağlamlıq imkanları məhdudluğunun qarşısının alınması, əlillərin və sağlamlıq imkanları məhdud uşaqların reabilitasiyası və sosial müdafiəsi haqqında” Azərbaycan Respublikasının 1992-ci il 25 avqust tarixli 284 nömrəli Qanunu (Azərbaycan Respublikası Ali Sovetinin Məlumatı, 1992, № 16, maddə 697; 1994, № 15, maddə 176; 1995, № 17-18, maddə 285; Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 1997, № 2, maddə 81, № 4, maddə 305, № 5, maddələr 356, 378, № 6, maddə 452; 1998, № 1, maddə 16; 1999, № 4, maddə 217, № 7, maddə 395; 2001, № 3, maddə 145, № 12, maddələr 731, 736; 2002, № 5, maddələr 244, 246, № 12, maddə 706; 2004, № 4, maddə 202, № 7, maddə 507, № 8, maddə 596; 2005, № 8, maddə 684; 2007, № 5, maddə 401; 2008, № 7, maddə 602; 2010, № 3, maddə 171, № 4, maddə 275, № 11, maddə 949; 2011, № 2, maddə 71, № 4, maddə 260, № 10, maddə 882) ləğv edilir.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

Bakı şəhəri, 31 may 2018-ci il
№ 1153-VQ

## İSTİFADƏ OLUNMUŞ MƏNBƏ SƏNƏDLƏRİNİN SİYAHISI

1. 1 fevral 2019-cu il tarixli **1483-VQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 14 mart 2019-cu il, № 59, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2019-cu il, № 3, maddə 381)**
2. 29 mart 2019-cu il tarixli **1552-VQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 26 may 2019-cu il, № 115, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2019-cu il, № 5, maddə 797)**
3. 12 iyul 2019-cu il tarixli **1661-VQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 22 avqust 2019-cu il, № 182, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2019-cu il, №8, maddə 1382)**
4. 19 may 2020-ci il tarixli **113-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 12 iyun 2020-ci il, № 134, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 7, maddə 831)**
5. 6 oktyabr 2020-ci il tarixli **185-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 27 noyabr 2020-ci il, № 248, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 11, maddə 1335)**
6. 4 may 2021-ci il tarixli **312-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 18 iyun 2021-ci il, № 125, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 6, I kitab, maddə 548)**
7. 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** *(2022-ci il iyulun 1-dən qüvvəyə minir)*
8. 2 iyul 2021-ci il tarixli **356-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 24 iyul 2021-ci il, № 151, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 7, maddə 710)**

## QANUNA EDİLMİŞ DƏYİŞİKLİK VƏ ƏLAVƏLƏRİN SİYAHISI

[1] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 1.0.2-ci maddədən "**, o cümlədən sağlamlıq imkanları məhdud 18 yaşınadək uşaq**" sözləri çıxarılmışdır.

[2] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 1.0.3-cü maddədən "**, müyəssərliyə nail olmaq üçün**" sözləri çıxarılmışdır.

[3] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 1.0.4-cü maddəyə "**zəruri**" sözündən əvvəl "**hər bir konkret halda**" sözləri əlavə edilmişdir.

[4] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 1.0.11-ci maddədə "**etdirməklə**" sözü "**etdirmək, habelə əlilliyi olan şəxsdə olmayan bacarıqların öyrədilməsi yolu ilə**" sözləri ilə əvəz edilmişdir.

[5] 6 oktyabr 2020-ci il tarixli **185-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 27 noyabr 2020-ci il, № 248, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 11, maddə 1335)** ilə 1.0.15-ci maddəyə "**digər şəxslərlə**" sözlərindən əvvəl "**xüsusi şərait yaratmaqla və xüsusi təlim vasitəsilə**" sözləri əlavə edilmişdir.

[6] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 3.1-ci maddədə "**əlilliyinin səbəbi, dərəcəsi**" sözləri "**orqanizminin funksiyalarının pozulması faizi, səbəbi" sözləri ilə və "orqanı" sözü "orqanının müəyyən etdiyi orqan (qurum)**" sözləri ilə əvəz edilsin, həmin maddənin ikinci cümləsi üçüncü cümlə hesab edilmişdir və yeni məzmunda ikinci cümlə əlavə edilmişdir.

[7] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 3.3 – 3.6-cı maddələrdə "**orqanı**" sözü "**orqanının müəyyən etdiyi orqan (qurum)**" sözləri ilə əvəz edilmişdir.

[8] 2 iyul 2021-ci il tarixli **356-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 24 iyul 2021-ci il, № 151, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 7, maddə 710)** yeni məzmunda 3.3-1-ci maddə əlavə edilmişdir.

[9] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 5.0.1-ci maddədə "**sağlamlıq imkanları məhdud 18 yaşınadək uşaqların**" sözləri "**18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin**" sözləri ilə əvəz edilmişdir.

[10] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 5.0.2-ci və 5.0.3-cü maddələrdə "**əlilliyinin növündən, formasından və ağırlıq**" sözləri "**orqanizmin funksiyalarının pozulması faizindən, əlilliyin növündən və insanın həyat fəaliyyətinin məhdudlaşma**" sözləri ilə əvəz edilmişdir.

[11] 4 may 2021-ci il tarixli **312-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **("Azərbaycan" qəzeti, 18 iyun 2021-ci il, № 125, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 6, I kitab, maddə 548)** ilə 8.3-cü maddədə "**orqanı**" sözü "**orqanının müəyyən etdiyi orqan (qurum)**" sözləri ilə, "**orqanlarının**" sözü

“**orqanının müəyyən etdiyi orqanın (qurumun)**” sözləri ilə əvəz edilmişdir.

[12] 19 may 2020-ci il tarixli **113-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 12 iyun 2020-ci il, № 134, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 7, maddə 831)** ilə 9.1-ci maddədə “**qüsurlarını**” sözü “**pozuntularını**” sözü ilə əvəz edilmişdir.

22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 9.1-ci maddədə “**sağlamlıq imkanlarının məhdudluğu**” sözləri “**əlillik**” sözü ilə əvəz edilmişdir.

[13] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 11.4-cü maddənin birinci və ikinci cümlələrində ismin müvafiq hallarında “**sağlamlıq imkanları məhdud 18 yaşınadək uşaqlar**” sözləri ismin müvafiq hallarında “**18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslər**” sözləri ilə əvəz edilmişdir.

[14] 19 may 2020-ci il tarixli **113-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 12 iyun 2020-ci il, № 134, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 7, maddə 831)** ilə 11.5-ci maddədə “**müəssisələri, idarələri və təşkilatları**” sözləri “**orqanları və dövlətə məxsus hüquqi şəxslər**” sözləri ilə əvəz edilmişdir.

[15] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 13.1-ci maddədən “**, onların infrastrukturlardan sərbəst istifadə etməsi üçün ağlabatan uyğunlaşma**” sözləri çıxarılmışdır.

[16] 19 may 2020-ci il tarixli **113-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 12 iyun 2020-ci il, № 134, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 7, maddə 831)** ilə 13.4-cü maddənin ikinci cümləsində “**əlil avtomobili**” sözləri **“əlilliyi olan şəxs” tanınma**” sözləri ilə əvəz edilmişdir.

[17] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 15.1-ci və 15.2-ci maddələrdən “**ağlabatan**” sözü çıxarılmışdır.

[18] 19 may 2020-ci il tarixli **113-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 12 iyun 2020-ci il, № 134, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 7, maddə 831)** ilə 16.3-cü maddədən “**və güzəştli şərtlərlə**” sözləri çıxarılmışdır.

[19] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 18-ci maddənin adında “**Sağlamlıq imkanları məhdud uşaqların**” sözləri “**18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin**” sözləri ilə əvəz edilmişdir.

[20] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 18.1-ci maddə yeni redaksiyada verilmişdir.

əvvəlki redaksiyada deyilirdi:

~~18.1. Sağlamlıq imkanları məhdud məktəbəqədər yaşlı uşaqların təlim və tərbiyəsi bu Qanunun 11-ci maddəsinə əsasən təsdiq edilmiş Fərdi Reabilitasiya Proqramına uyğun olaraq, sağlamlıq imkanları məhdud uşaqlar üçün dövlət, bələdiyyə və özəl xüsusi məktəbəqədər təhsil müəssisələrində və ya inklüzivlik prinsiplərinə əsasən digər məktəbəqədər təhsil~~

~~müəssisələrində həyata keçirilir.~~

[21] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 18.2-ci maddədə “**sağlamlıq imkanları məhdud uşaqların**” sözləri “**18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin**” sözləri ilə əvəz edilmişdir.

[22] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 18.3-cü maddədə “**sağlamlıq imkanları məhdud uşaqları**” sözləri “**18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxsləri**” sözləri ilə əvəz edilmişdir.

[23] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 19-cu maddənin adında “**sağlamlıq imkanları məhdud uşaqların**” sözləri “**18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin**” sözləri ilə əvəz edilmişdir.

[24] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 19.1-ci maddədə “**sağlamlıq imkanları məhdud uşaqların**” sözləri “**18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslərin**” sözləri ilə, “**orqanı tərəfindən**” sözləri “**orqanının müəyyən etdiyi orqan (qurum) tərəfindən “Sağlamlıq imkanları məhdud şəxslərin təhsili (xüsusi təhsil) haqqında” Azərbaycan Respublikası Qanununun 10-cu maddəsinə uyğun olaraq**” sözləri ilə əvəz edilmişdir.

[25] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 19.2-ci maddə ləğv edilmişdir.

[26] 29 mart 2019-cu il tarixli **1552-VQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 26 may 2019-cu il, № 115, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2019-cu il, № 5, maddə 797)** ilə 20.1-ci maddəyə “**Təhsil haqqında**”,” sözlərindən sonra “**Ümumi təhsil haqqında”,”** sözləri əlavə edilmişdir.

6 oktyabr 2020-ci il tarixli **185-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 27 noyabr 2020-ci il, № 248, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 11, maddə 1335)** ilə 1.0.15-ci maddəyə “**digər şəxslərlə**” sözlərindən əvvəl “**xüsusi şərait yaratmaqla və xüsusi təlim vasitəsilə**” sözləri əlavə edilmişdir.

[27] 19 may 2020-ci il tarixli **113-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 12 iyun 2020-ci il, № 134, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 7, maddə 831)** ilə 20.2-ci maddədə “**təhsil planı**” sözləri “**tədris planı**” sözləri ilə əvəz edilmişdir.

[28] 12 iyul 2019-cu il tarixli **1661-VQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 22 avqust 2019-cu il, № 182, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2019-cu il, №8, maddə 1382)** ilə 20.3-cü maddə yeni redaksiyada verilmişdir.

Əvvəlki redaksiyada deyilirdi:

~~20.3. Müvafiq icra hakimiyyəti orqanında işaxtaran kimi qeydiyyata alınmış və 18 yaşı tamam olmuş əlilliyi olan şəxslərin peşə hazırlığı və əlavə təhsili həmin orqanın göndərişi əsasında bu Qanunun 11-ci maddəsinə əsasən təsdiq olunmuş Fərdi Reabilitasiya Proqramına uyğun olaraq təhsil müəssisələrində, o cümlədən müvafiq icra hakimiyyəti orqanının tədris mərkəzlərində təmin edilir.~~

22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 24.5-ci maddədə “**I və II dərəcə**

**əlilliyi olan**” sözləri “**orqanizmin funksiyalarının 61-100 faiz pozulmasına görə əlilliyi müəyyən edilmiş**” sözləri ilə əvəz edilmişdir.

[29] 29 mart 2019-cu il tarixli **1552-VQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 26 may 2019-cu il, № 115, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2019-cu il, № 5, maddə 797)** ilə yeni məzmunda 20.7-ci maddə əlavə edilmişdir.

[30] 19 may 2020-ci il tarixli **113-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 12 iyun 2020-ci il, № 134, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2020-ci il, № 7, maddə 831)** ilə 24.5-ci maddədə “**qrup**” sözü “**dərəcə**” sözü ilə əvəz edilmişdir.

[31] 22 iyun 2021-ci il tarixli **346-VIQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 21 avqust 2021-ci il, № 175, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2021-ci il, № 8, maddə 892)** ilə 32.3-cü maddədə “**sağlamlıq imkanları məhdud uşaqlar**” sözləri “**18 yaşınadək əlilliyi müəyyən edilmiş şəxslər**” sözləri ilə əvəz edilmişdir.

[32] 1 fevral 2019-cu il tarixli **1483-VQD** nömrəli Azərbaycan Respublikasının Qanunu **(“Azərbaycan” qəzeti, 14 mart 2019-cu il, № 59, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2019-cu il, № 3, maddə 381)** ilə yeni məzmunda 32-1-ci maddə əlavə edilmişdir.